**UOT-338**

# ÖLKƏDƏ KƏND TƏSƏRRÜFATI MƏHSULLARI İSTEHSALININ MÜASİR VƏZİYYƏTİ VƏ İNKİŞAF ETDİRİLMƏSİ İSTİQAMƏTLƏRİ

**R.M.QƏMBƏROVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Hazırda ölkənin inkişaf göstəriciləri arasında aqrar sahənin xüsusi yeri vardır.Dövlət əhalinin ərzağa olan daxili tələbatını əsasən öz potensialı və imkanları hesabına ödəyə bilməsi üçün regionlarda infrastruktur sahələrinin yaradılması və kənd təsərrüfatının inkişaf etdirilməsi istiqamətində mühüm islahatlar reallaşdırıb və bu proses davam etdirilir.Aqrar sahənin əsas istiqamətlərindən olan,pambıqçılıq, baramaçılıq, çayçılıq, tütünçülük, fındıqçılıq və digər valyuta gətirən, ixracyönümlü və sosialyönümlü sahələrin inkişafıməqalədə öz əksini tapmışdır.*

***Açar sözlər:*** *kənd təsərrüfatı, məhsul, istehsal, ərzaq təhlükəsizliyi, daxili tələbat.*

Kənd təsərrüfatı - aqrar sənaye kompleksinin əsas sahələrindən biridir. Onun əsas məqsədi ölkə əhalisinin ərzaq və ekoloji təminatını həyata keçirmək, bütün regionlarda sosial-iqtisadi inkişafın sürərləndirilməsinə nail olmaq, emal sənayesi üçün xammal istehsal etmək, əkinşilik və heyvandarlıq məhsulları istehsalını müasir texnologiyalar əsasında təşkil etmək, kənd təsərrüfatı məhsulları istehsalı və emalı üçün zəruri sayılan infrastrukturu yaratmaqdır. [6]

Iqtisadiyyatın qeyri-neft sektorunda xüsusi çəkiyə malik olan kənd təsərrüfatı sürətlə inkişaf etməkdədir. Kənd təsərrüfatı sahəsinə qoyulan investisiyalar ilbə-il artmaqdadır. Tələbata cavab verən texnologiyalar alınır, dövlət tərəfindən subsidiyalar ayrılır, aqro xidmət sahələri yaradılır, güzəştli şərtlərlə gübrə, yanacaq, lizinqlər verilir. Həmçinin, sahibkarlara güzəştli şərtlərlə kreditlər verilir. Bu baxımdan, yeni aqrar istehsal sahələri yaranır. Bunun nəticəsində də ölkəmizdə aqrar sahədə məhsul istehsalının artması yeni emal müəssisələrinin yaradılması tələbatını zəruri edir.

Etibarlı ərzaq təminatı hər bir ölkənin iqtisadi sabitliyinin və sosial dayanıqlığının başlıca şərtidir. Bu baxımdan Azərbaycanda əhalinin ərzaqla etibarlı təminatı məqsədilə bir sıra tədbirlər və ərzaq təhlükəsizliyinin birbaşa asılı olduğu aqrar sahənin inkişafına istiqamətlənən dövlət proqramları həyata keçirilir. Hazırda ölkədə əhalinin etibarlı ərzaq təminatı dövlətin iqtisadi siyasətinin başlıca istiqamətlərindən birini təşkil edir.

Azərbaycan Prezidenti İlham Əliyevin 24 noyabr 2003-cü ildə imzaladığı "Azərbaycan Respublikasında sosial-iqtisadi inkişafın sürətləndirilməsi tədbirləri haqqında" fərmanı ilə ölkədə aqrar sahədə yeni inkişaf modelinin tətbiqinə başlanmışdır. Həmin fərmanın məntiqi davamı olan 11 fevral 2004-cü il tarixində qəbul edilmiş "Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər)" aqrar sektorda islahatların ikinci mərhələsini sürətləndirmək üçün bu sahədə köklü dəyişikliklərin aparılması və kənd təsərrüfatında sahibkarlıq fəaliyyətinin inkişaf etdirilməsi istiqamətlərini müəyyənləşdirdi. Dövlət Proqramında aqrar emal müəssisələrinin fəaliyyətinin bərpa olunması, yeni istehsal müəssisələrinin və infrastrukturun yaradılması, yerli resurslardan istifadənin səmərəliliyinin artırılması, regionlarda texniki servis mərkəzlərinin təşkili, toxumçuluq bazasının genişləndirilməsi və digər zəruri tədbirlərin həyata keçirilməsi nəzərdə tutulurdu.[2]

Respublikamızın ərzaq təhlükəsizliyinin təmin olunmasını iqtisadi strategiyanın əsas hədəflərindən biri hesab edən Azərbaycan hökuməti aqrar sahədə istehsal imkanlarının daha da yaxşılaşdırılması üçün davamlı addımlar atır. 2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatı Dövlət Proqramı ölkədə ərzaq təhlükəsizliyinin həlli baxımından xüsusi əhəmiyyət daşıyır.[3]

Qeyd etmək lazımdır ki, ərzaq təhlükəsizliyinin təminatı daxili istehsal və emal sahələrinin inkişafını sürətləndirir. Bu da rəqabətqabiliyyətli məhsulların istehsalını stimullaşdırır. Ölkəmizdə sahibkarlığın inkişafı istiqamətində görülən işlərin məntiqi nəticəsidir ki, Azərbaycanda özəl sektor da dinamik inkişaf edir. Daxili bazarın rəqabətqabiliyyətli məhsullarla təminatı vətəndaşların ölkədə istehsal olunan ən yüksək keyfiyyətli ərzaq məhsulları ilə təmin edilməsini zəruri edir. Lakin kənd təsərrüfatının, emal sənayesinin sürətli inkişafı istehsal edilən məhsulların keyfiyyət və kəmiyyətcə rəqabət qabiliyyətli olması və xarici bazarlara çıxa bilməsini labüdləşdirir. Ona görə də, rəqabətqabiliyyətli məhsulların istehsalının artırılması ən vacib məsələlərdən biridir.

Son illər aqrar islahatların nəticəsidir ki, kənd təsərrüfatı sürətlə inkişaf etmişdir. Bu səbəbdən də adambaşına düşən ərzaq məhsullarının istehsalı xeyli artmışdır. Bir çox sahələrdə olduğu kimi, bitkiçilik məhsullarının istehsalının strukturunda da müsbət nəticələr əldə edilmişdir.Bu, ilk növbədə, ölkənin əkin strukturuna təsir edərək, onun daxili və xarici bazarın tələblərinə uyğun formalaşmasına imkan verir.

Ərzaq məhsullarına olan tələbatın ödənilməsində idxaldan ən yüksək asılılıq bitki yağlarının payına düşür. Eyni zamanda, ölkədə bu məhsulun, xüsusilə zeytun istehsalının artırılması üçün böyük potensial mövcuddur. Eynilə kartof, tərəvəz, şəkər çuğunduru və digər kənd təsərrüfatı məhsullarının istehsalı sahəsində təsərrüfat fəaliyyətinin intensivləşdirilməsi əsasında məhsul artımına nail olmaq mümkündür.

Kənd təsərrüfatında ənənəvi sahə olan pambıqçılıq, baramaçılıq, çayçılıq, tütünçülük, fındıqçılıq və digər valyuta gətirən, ixracyönümlü və sosialyönümlü sahələrin inkişafına diqqət artırılıb. Çünki əsas məqsəd Azərbaycanı dünyada təkcə neft-qaz ölkəsi kimi deyil, həm də aqrar ölkə kimi tanıtmaqdır. Bunun üçün ilk növbədə yüksək keyfiyyətli və ekoloji təmiz məhsullar istehsal olunması vacib şərtlərdəndir.

Aqrar islahatların uğurlu həyata keçirilməsinin nəticəsidir ki, artıq kənd təsərrüfatının ayrı-ayrı sahələri üzrə müsbət nəticələr əldə edilmişdir. Belə ki, 2016-cı ildə ÜDM-də kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq 3369,6 milyon manatlıq əlavə dəyər yaratmaqla çəkisi 5,6% olmuşdur. 2015-ci illə müqayisədə kənd təsərrüfatının ümumi məhsulu 2,6 faiz, o cümlədən heyvandarlıq məhsulları istehsalı 2,8 faiz, bitkiçilik məhsulları istehsalı isə 2,5 faiz artmışdır. Qeyd etmək lazımdır ki, 2016-cı ildə kənd təsərrüfatının ümumi məhsulunun faktiki qiymətlərlə dəyəri 5632,4 milyon manat olmuşdur. 2016-cı ildə payızlıq və yazlıq dənli və dənli paxlalı bitkilərin 997,5 min hektar əkin sahəsindən 3065,1 min ton və ya 2015-ci illə müqayisədə 2,2 faiz yəni 65,7 min ton çox məhsul götürülmüşdür. Orta hesabla hər hektardan əldə edilmiş məhsul 30,7 sentner təşkil etmişdir.

Bu baxımdan qeyd etmək lazımdır ki, 2016-cı ildə 902,4 min ton və ya əvvəlki ilə nisbətən 7,5 faiz çox kartof, 1269,3 min ton (0,5 faiz az) tərəvəz, 464,6 min ton (4,1 faiz az) bostan məhsulları, 883,7 min ton (0,5 faiz az) meyvə və giləmeyvə, 134,5 min ton (14,4 faiz az) üzüm, 1015,7 ton (75,4 faiz çox) yaşıl çay yarpağı, 321,3 min ton (72,7 faiz çox) şəkər çuğunduru, 17,1 min ton (9,3 faiz az) dən üçün günəbaxan, 3598,2 ton (3,8 faiz çox) tütün yarpağı yığılmışdır.

Son illər bitkiçilik məhsulları içərisində çəltik istehsalı üçün də əkin sahələrinin genişləndirilməsi nəticəsində bu məhsulun istehsalı 1,9 dəfə və ya 2,7 min ton artaraq 5,6 min tona yüksəlmişdir.2016-cı ildə 883,7 min ton meyvə və giləmeyvə, 134,5 min ton üzüm məhsulu yığılmışdır. Bundan başqa, yaşıl çay yarpağı istehsalı keçən ilin müvafiq dövrünə nisbətən 436,7 ton artaraq 1015,7 tona çatmışdır.

2016-cı ildə quş əti də daxil olmaqla diri çəkidə 523,8 min ton ət, 2009,9 min ton süd, 1609,8 milyon ədəd yumurta və 16,7 min ton yun istehsal edilmişdir. Ət istehsalı 2015-ci illə müqayisədə 8,2 min ton və ya 1,6 faiz, süd istehsalı 85,4 min ton və ya 4,4 faiz, yumurta istehsalı 56,9 milyon ədəd və ya 3,7 faiz artmışdır.

2016-cı il ərzində əsas kapitala yönəldilmiş ümumi vəsaitin 2,1%-i yəni 325,1 milyon manatı kənd təsərrüfatı, meşə təsərrüfatı və balıqçılıq sahəsinə sərf edilmişdir.

Hazırda şəkər çuğunduru istehsalının artırılması istiqamətində xeyli işlər görülməkdədir. Bu məqsədlə də 2016-cı ildə Azərbaycanda cəmi 7100 hektar sahədə şəkər çuğunduru əkilib və 312605 ton məhsul yığılıb.2000-ci illə müqayisədə 2016-cı ildə respublika üzrə şəkər çuğunduru istehsalı 6,7 dəfə artaraq ən yüksək həddə çatıb. Məhsuldarlıqda da vəziyyət qənaətbəxşdir. Belə ki, müvafiq ildə hektardan 490 sentner olmaqla 2000-2016-cı illər arasında məhsuldarlıq ən yüksək həddə çatıb.

Azərbaycan Dövlət statistika Komitəsinin məlumatına əsasən 2016-cı ildə çay əkmələrinin sahəsi 1000 ha, ümumi yığım 1020 ton, məhsuldarlıq 1 hektardan 14,1 sentner olmuşdur. 1995-ci illə müqayisədə çay əkmələrinin sahəsi 11 dəfə, ümumi yığım 9 dəfə azalmış, məhsularlıq isə 36% artmışdır. 2015-ci illə müqayisədə 2016-cı ildə ümumi yığım 75%, məhsuldarlıq isə 14 % artmışdır. Əkin sahəsi hər iki ildə 1000 ha olmuşdur.

Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan Respublikasında pambıqçılığın inkişafına dövlət dəstəyi haqqında" 2016-cı il 22 sentyabr tarixli 2350 nömrəli Sərəncamına uyğun olaraq, təhvil verdikləri hər kiloqram xam pambığa görə pambıq istehsalçılarına 0,1 manat subsidiyanın verilməsi və eyni zamanda, şirkətlər tərəfindən xam pambığın tədarük qiymətinin artırılması bu sahənin inkişafına əlavə stimul vermişdir. 2015-ci illə müqayisədə isə 2016-cı ildə pambıq istehsalı 2,5 dəfə artmışdır.

2014-cü ildə Azərbaycanda 1740 hektara yaxın zeytun bağları vardır ki, bunlardan da 1725 hektarı barvermə imkanına malikdir. 2014-cü ildə respublika üzrə 846 ton məhsul, 60 tona yaxın zeytun yağı istehsal edilib. 2016-cı ildəbarvermə imkanına malik zeytun bağlarının sahəsi 2978,6 ha olmaqla 2014- cü illə müqayisədə 73 % artmışdır.Məhsul istehsalında da 2014-cü illə müqayisədə 2016-cı ildə 87,4% artmaqla 1586,2 ton təşkil etmişdir.

Fındıqçılıq ölkəmizə valyuta gətirən sahədir. 2016-cı ildə ölkəmizdən 105 milyon ABŞ dolları məbləğində fındıq ixrac olunub. İxracımız əsasən İtaliya, Rusiya və Almaniyayadır. Ümumilikdə, keçən il 25-ə yaxın ölkəyə fındıq ixrac edilib.

Aqrar sektorun dinamik inkişafı əkin dövriyyəsinin getdikcə artmasında da özünü göstərir. Aqrar sektorun inkişafı, əkin sahələrinin genişləndirilməsi həm də yeni iş yerləri, kənd əhalisinin məşğulluğunun təmin olunması və artan gəlirlər deməkdir. Azərbaycan kənd təsərrüfatının inkişafı baxımından böyük potensiala malik ölkələrdən hesab olunur. Hazırda ölkəmizdə aqrar sektorun inkişafı əhalinin əsas kənd təsərrüfatı məhsullarına olan tələbatını ödəməyə imkan verir. Aqrar sektorun inkişafı, əhalinin ərzaq təhlükəsizliyinin təmin edilməsi "Azərbaycan - 2020: Gələcəyə Baxış" İnkişaf Konsepsiyasında da əsas istiqamətlərdən biri kimi nəzərdə tutulur.

## ƏDƏBİYYAT

1.Azərbaycan Respublikasında 2009-2015-ci illərdə elmin inkişafı uzrə Milli Strategiya, Azərbaycan Respublikası Prezidentinin 4 may 2009-cu il Fərmanı ilə təsdiq edilmişdir. 2. Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər), Azərbaycan Respublikası Prezidentinin 11 fevral 2004-ci il 24 nömrəli Fərmanı ilə təsdiq edilmişdir. 3. 2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair Dövlət Proqramı, Azərbaycan Respublikası Prezidentinin 25 avqust 2008-ci il 3004 nömrəli Sərəncamı ilə təsdiq edilmişdir. 4."Azərbaycan 2020: Gələcəyə Baxış" inkişaf konsepsiyası.2012-ci il 29 dekabr. 5."Azərbaycan Respublikasının kənd təsərrüftaı".Azərbaycan Dövlət Statistika Komitəsi, Bakı, 2016. 6.Eldar Quliyev. Aqrar iqtisadiyyat. Kooperasiya nəşriyyatı-2015. 320 səh.

### Современное состояние производства сельскохозяйственной продукции в стране и направления его развития

**Р.М. Гамбарова**

В настоящее время среди показателей развития страны особое место занимает аграрная отрасль. Для удовлетворения потребности населения в продовольствии в основном за счет собственного потенциала и возможностей государство реализовало важные реформы по созданию отраслей инфраструктуры в регионах и развитию сельского хозяйства, и этот процесс продолжается. В статье нашло свое отражение развитие таких основных направлений аграрной отрасли, как хлопководство, шелководство, чаеводство, табаководство, фундуководство и прочие отрасли экспортного и социального направления, приносящие валюту.

***Ключевые слова:****сельское хозяйство,продукция, производство, продовольственная безопасность, внутренние потребности.*

### The current state of agricultural production in the country and the direction of its development

**R..M.Gambarova**

At present, the agrarian sector takes a special place among the indicators of the country's development.In order to satisfy the population's food needs mainly due to their own capabilities and capabilities, the state has implemented important reforms to create infrastructure sectors in the regions and develop agriculture, and this process continues.The article reflects the development of such key areas of the agrarian sector as cotton growing, silkworm breeding, tea growing, tobacco growing, hazelnuts and other branches of export and social direction that bring in currency.

***Key words:*** *agriculture, production, production, food security, domestic needs.*